## *MÜQƏDDİMƏ*

Həqiqətən həmd sənalar Allaha məxsusdur. Biz də Ona həmd səna edir, Ona sığınır və Ondan bağışlanma diləyirik. Nəfsimizin şərindən və pis əməllərimizdən Allaha pənah aparırıq. Allahın doğru yola yönəltdiyi kimsəni heç kəs bu yoldan azdıra bilməz, haqq yoldan azdırdığı kimsəni isə heç kəs doğru yola yönəldə bilməz. Mən şəhadət verirəm ki, Allahdan başqa haqq məbud yoxdur və şəhadət verirəm ki, Məhəmməd Onun qulu və elçisidir.

**"Ey iman gətirənlər! Allahdan layiqincə qorxun. Yalnız müsəlman olduğunuz halda (müsəlman kimi) ölün!"** (Ali-Imran, 102)

**"Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan zövcəsini (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! (Adı ilə) bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, Allah sizin üzərinizdə gözətçidir!"** (ən-Nisa, 1)

**"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin! (Əgər belə etsəniz, Allah) əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə (Cənnətə) nail olar."** (əl-Əhzab, 70-71)

Həqiqətən ən doğru söz Allahın kəlamı və ən xeyirli hidayət yolu Məhəmmədin (ona Allahın salavatı və salamı olsun) yoludur. Əməllərin ən şərlisi (dinə əlavə edilmiş) yeniliklərdir. Hər bir yenilik bidət və hər bir bidət isə zəlalətdir.

Uca Allahın Öz əzəmətli Kitabında insanları sövq etdiyi və Peyğəmbərin (ona Allahın salavatı və salamı olsun) də öz pak sünnəsində əmr etdiyi ən yüksək xeyirxahlıq sifətlərindən biri səbrli olmaqdır. Səbr sözü Quranda yüz dörd yerdə müxtəlif səbəb və məqamlarda varid olmuşdur.

Uca Allah Öz peyğəmbərinə səbrli olmağı əmr etmiş və buyurmuşdur:

**(Ya Rəsulum! Allah yolunda olan bütün əzab-əziyyətə) səbr et. Sənin səbr etməyin yalnız Allahın köməyilədir.** (ən-Nəhl,127)

**Ya Rəsulum!) Peyğəmbərlərdən əzm (və səbat, şəriət) sahibləri olanların səbr etdiyi kimi, sən də (Allah yolunda çətinliklərə, əziyyətlərə) səbr et.** (əl-Əhqaf, 35)

Həmçinin Allah təalə möminlərə də səbrli olmağı əmr etmişdir. O, buyurur:

**Ey iman gətirənlər! (Dində vacib olan hökmləri yerinə yetirməyin zəhmətinə, düçar olduğunuz bəlalara) səbr edin, (Allahın düşmənlərinə qələbə çalmaq uğrundakı müharibə və döyüşlərdə sizə üz verən müsibət və çətinliklərə) dözün!** (Ali-Imran, 200)

Uca Allah səbr edənləri təriflədərək buyurur:

**Yaxşı əməl sahibi əslində ... dar ayaqda, çətinlikdə (ehtiyac, yaxud xəstəlik üz verdikdə) və cihad zamanı (məşəqqətlərə) səbr edənlərdir. Onlar (İmanlarında, sözlərində və əməllərində) doğru olanlardır. Müttəqi olanlar da onlardır!** (əl-Bəqərə, 177)

O səbr edənləri sevdiyini və onlarla birlikdə (bərabər) olduğunu xəbər verərək buyurur:

"**Allah səbr edənləri sevir.**" (Ali-Imran, 146)

"**Səbr edin, həqiqətən Allah səbr edənlərlədir!**" (əl-Ənfəl, 46)

Bu ayədə isə Allah təalə səbr etməyin səbr edənlər üçün xeyirli olduğunu bəyan etmişdir:

"**Əgər (onlardan intiqam almayıb) səbr etsəniz, bu, səbr edənlər üçün daha xeyirlidir.**" (ən-Nəhl, 126)

Rəbbimiz səbr edənləri onların etdiklərindən qat-qat üstün və daha yaxşı mükafatlarla mükafatlandıracağını vəd vermişdir. O buyurur:

"**(Allah yolunda) səbr edənləri etdikləri yaxşı əməllərin müqabilində daha yaxşı mükafatlarla mükafatlandıracağıq!**" (ən-Nəhl, 96)

"**Yalnız (dünyada Allah yolunda çətinliklərə) səbr edənlərə (axirətdə) saysız-hesabsız mükafat veriləcəkdir!**" (əz-Zumər, 10)

Həmçinin onları müjdəliyərək buyurur:

"**(Ya Rəsulum! Belə imtahanlara) səbr edən şəxsləri müjdələ!**" (əl-Bəqərə, 155)

Səbr edənlərin mükafatı Cənnət olacağı haqda isə Allah təalə deyir:

"**Və onları etdikləri səbr müqabilində Cənnətlə və (geyəcəkləri) ipəklə mükafatlandıracaqdır.**" (əl-Insan, 12)

Uca Allah səbri Islam dinində ən əzəmətli sayılan işlərlə bir sırada qeyd etmişdir. Səbrlə yanaşı gələn bu əzəmətli işlər barəsində Quran ayələrindən:

Yəqinlik;

**"(Çətinliklərə) səbr etdikləri və ayələrimizə yəqinliklə (ürəkdən) inandıqları üçün Biz onlardan (İsrail oğullarından) əmrimizlə (insanlara) haqq yolu göstərən rəhbərlər təyin etmişdik."** (əs-Səcdə, 24)

Təvəkkül;

**"(Yaxşı əməllər) edənlərin mükafatı necə də gözəldir! O kəslər ki, səbr edər və yalnız Rəbbinə təvəkkül edərlər (bel bağlayarlar)!"** (əl-Ənkəbut, 58-59)

Namaz;

**"Ey iman gətirənlər! Səbir və namaz ilə (dua ilə Allahdan) kömək diləyin. Çünki Allah səbr edənlərlədir (onların dostudur)."** (əl-Bəqərə, 153)

Təqva (Allahdan qorxmaq);

**"Əgər səbr etsəniz və Allahdan qorxsanız (təqvalı olsanız), onların hiyləsi sizə heç bir zərər yetirməz."** (Ali-Imran, 120)

**"Əgər səbr etsəniz və Allahdan qorxsanız (təqvalı olsanız), əlbəttə, bu, məqsədə müvafiq (dəyərli) işlərdəndir".** (Ali-Imran, 186)

**"Kim Allahdan qorxub (təqvalı olub) səbr etsə (pis əməllərdən çəkinsə) (bilsin ki) Allah yaxşı işlər görənlərin mükafatını əsla zay etməz!"** (Yusif, 90)

Saleh əməl;

**"Səbr edənlər və yaxşı işlər görənlər müstəsnadır. Məhz onları (günahlardan) bağışlanma və böyük bir mükafat gözləyir."** (Hud, 11)

Cihad;

**"Fitnəyə məruz qaldıqdan sonra hicrət edənləri, daha sonra cihad edib (bu yolda hər cür əzab-əziyyətə) səbr edənləri isə (bütün) bunlardan sonra Rəbbin, şübhəsiz ki, bağışlayandır, (onlara) rəhm edəndir!"** (ən-Nəhl, 110)

**"(Ey möminlər!) And olsun ki, Biz içərinizdəki mücahidləri və (əziyyətlərə) səbr edənləri ayırd edib bilmək (ümmətə məlum etmək) üçün sizi imtahana çəkəcəyik"** (Məhəmməd, 31)

Istiğfar (bağışlama) diləmək və təsbih (Allahı zikr) etmək;

**"(Ya Peyğəmbər! Allahın əmrinə, müşriklərin əziyyətinə) səbr et. Allahın (sənə və möminlərə verdiyi zəfər) vədi haqdır. (Ümmətinin sənin özünə aid etdiyin) günahının bağışlanmasını dilə. Axşam-səhər Rəbbini həmd-səna ilə təqdis et! (Daim Allahı zikr et və ya gündə beş vaxt namaz qıl!)"** (əl-Mumin, 55)

**"(Ya Peyğəmbər!) Sən öz Rəbinin hökmünə səbr et! Şübhəsiz ki, sən Bizim gözümüzün qabağındasan (himayəmiz altındasan). (Namaza) qalxdıqda Rəbbini həmd-səna ilə zikr et!"** (ət-Tur, 48)

**"(Ya Rəsulum! Elədə Məkkə müşriklərinin) dediklərinə səbr et. Günəş doğmamışdan və batmamışdan əvvəl Rəbbinə şükür edib şəninə təriflər de (sübh və əsr namazlarını qıl), gecənin bir vədəsində (axşam və gecə saatlarında) və günorta radələrində də Rəbbini öyüb təqdis et (şam, gecə və günorta namazlarını qıl) ki, (bunun müqabilində Allahın səni böyük savaba, yüksək dərəcələrə, yaxud ümmətin üçün şəfaətə nail etməsindən) razı (xoşhal) olasan!"** (Taha, 130)

Haqq;

"**And olsun axşam çağına (ikindi vaxtına, əsr namazına, zamana və ya Peyğəmbərin əsrinə) ki, Insan (ömrünü bihudə işlərə sərf etməklə, dünyanı axirətdən üstün tutmaqla) ziyan içindədir? Yalnız iman gətirib yaxşı əməllər edən, bir-birinə haqqı tövsiyə edən və səbri tövsiyə edən kimsələrdən başqa! (Beləlləri Cənnətə nail olub əbədi səadətə qovuşanlardır!)**" (əl-Əsr, 1-3)

Rəhmət;

"**Sonra da iman gətirən və bir-birinə səbr tövsiyə edən, mərhəmət tövsiyə edən kimsələrdən olmaqdır!**" (əl-Bələd, 17)

Şükür;

"**Bunda çox səbir və şükür edənlər üçün, sözsüz ki, neçə-neçə ibrətlər var!**" (Ibrahim, 5)

Quranda müxtəlif məqamlarda səbrə dəlalət edən ayələrin olması, həmçinin bu barədə sünnədə varid olan hədislər onun əhəmiyyətinə və şəninin uca olmasına dəlalət edir. Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) ümmətini bu gözəl əxlaqa sövq etmişdir. Onun həyatı bu ali əxlaqın bütün növlərinə ən gözəl nümunədir. Kim əgər onun həyatını

və sünnəsini öyrənərsə səbr etməyin yüksək məqama malik olduğunu bilər.

**dr. Məhəmməd ibn Xəlifə**

**بسم الله الرحمن الرحيم**

*Rəhmli və mərhəmətli Allahın adı ilə.*

**Şeyxulislam Təqiyyuddin Əbul Abbas Əhməd ibn Teymiyyə buyurur:**

**Fəsil:**

Uca və nöqsansız Allah Öz mömin bəndələrini siniflərə bölmüş və hər sinfi öncəkindən daha üstün etmişdir. Buna görə də möminlərin başına yaxşı və ya xoşagəlməz işlər gəlsədə, onlar daim rəblərinin verdiyi nemət içindədirlər. Həmçinin Allah Öz qəza və qədərini onlar üçün qazanclı ticarət və haqqa aparan yol etmişdir. Necə ki, səhih əsərində möminlərin imamı (ona Allahın salavatı və salamı olsun) buyurmuşdur (hansı ki, qiyamət günü hər kəs öz imamı ilə çağrılacağı zaman möminlər də onunla çağırılacaqlar[1]): ***"Mömininin işi nə qəribədir. Həqiqətən, onun bütün işləri qəribədir. Allah ona elə bir şey təqdir etməmişdir ki, onun üçün xeyir olmasın. Başına yaxşı bir iş gəldikdə şükr edər və bu onun üçün xeyirlidir. Müsibət üz verdikdə isə səbr edər. Bu da onun üçün xeyirlidir."*** [2]

Bu hədis Allahın hər bir mömin üçün təqdir etdiyi bütün qədəri əhatə edir. Çünki yaxşısına şükr, xoşagəlməzinə isə səbr edərsə, Allahın

---

[1] Bu əsəri, əl-Xatib "Tarix Bağdad" (1/317) əsərində Ənəsdən nəql etmişdir. İsra surəsinin 71-ci ayəsi, **"Bir gün (qiyamət günü) bütün insanları öz imamları ilə birlikdə (hüzurumuza) çağıracağıq."** haqda o demişdir: yəni, "öz peyğəmbərləri ilə birlikdə" . Suyuti "Dərrul-mənsur" (5/316) əsərində bu rəvayətin İbn Əbi Hatim və İbn Mərdəvih tərəfindən söylənildiyini bildirmişdir. Eyni məna Mücahiddən də rəvayət edilmişdir. Onu İbn Cərir öz təfsirində (15/126) və Suyuti "Dərrul-mənsurda" ibn Munzirdən nəql etmişdir.

[2] Hədisi, Imam Müslim ("Zühd" kitabi, "Mömininin bütün işləri xeyirdir" fəsli (8/227)); Imam Əhməd ("Musnəd" əsəri (1/173)) və əd-Dərimi ("Sünən" əsəri, "ər-Raqaiq" kitabı, "Mömin hər işinə görə əcr qazanır" fəsli (2/318)) rəvayət etmişdir. Hədisin ləfzi belədir: ***"Mömininin işi nə qəribədir. Həqiqətən, bütün işləri onun üçün xeyirdir...."***

Lakin hədisi müəllifin qeyd etdiyi kimi: ***"...bütün işləri qəribədir...."*** ləfzi ilə tapa bilmədim.

qəza-qədəri onun üçün hər zaman xeyirli sayılar. Həmçinin bu, imandandır. Neçə ki, bəzi sələflər demişdir: "Iman iki hissədən ibarətdir. Yarısı şükr, yarısı isə səbrdir."[3] Allah təalə buyurur: **"Həqiqətən, bunda çox səbir və şükür edən hər kəs üçün, neçə-neçə ibrətlər vardır!"** [4]

Əgər bir kəs dinin bütün sahələrinə nəzər salsa görər ki, o ümumən səbr və şükr üzərində qurulmuşdur. Ona görə ki, səbrin üç növü var:

**Birinci:** Allaha itaət olan bir əməli edənə qədər ona səbr etmək. Çünki elə bir əməl yoxdur ki, onu yerinə yetirmək üçün insan zahiri və batini düşmənlərinə qarşı mübarizə aparmasın və səbr etməsin. Həm vacib, həm də müstəhəb (bəyənilən) əməlləri yerinə yetirmək üşün səbrli olması insana yetər.

**Ikinci:** Qadağan edilmiş əməli etməmək üşün səbr etmək. Həqiqətən insanın nəfsi, onun tələbləri, şeytanın gözəlləşdirdikləri və pis yoldaşlar asilikləri əmr edir və günahlara sürükləyir. Insana güclü səbri kifayət edər ki onları tərk etsin. Bəzi sələflər demişdir: "Yaxşı əməlləri həm yaxşı, həm də pis insan edə bilər. Asilikləri (günahları) tərk etməyə isə yalnız siddiqlər qadirdir."[5]

**Üçüncü:** Insanın ixtiyarı olmadan başına gələn müsibətlərə səbr etmək. Müsibətlərin iki növü var:

---

[3]Vaki bin Cərrah "Zühd" əsərində (2/456, hədis 203), ət-Təbərani "əl-Kəbir" əsərində (9/107), əl-Munziri "ət-Tərğib və ət-tərhib" əsərində (4/171, hədis 4974) ibn Məsuddan "Səbr imanın yarısı, yəqinlik isə hamısıdır." ləfzi ilə rəvayət etmişdir.
Həmçinin Buxari "Səhih" əsrində "Iman" kitabı, "Peyğəmbərin (ona Allahın salavatı və salamı olsun) "Islam beş dayaq üzərində qurulmuşdur" kəlamı" fəslində öz şərtinə uyğun olaraq ibn Məsuddan "Yəqinlik imanın hamısıdır." ləfzi ilə rəvayət etmişdir. ...
Şeyx əl-Albani "Silsilə əl-əhədis əd-daifə" əsərində (1/506-507, hədis 499) bu hədis haqqında "münkər" demişdir. Onun sözünün xülasəsi: bu hədisin ibn Məsuddan rəvayət olunması səhih, peyğəmbərdən (ona Allahın salavatı və salamı olsun) rəvayət olunması isə zəifdir. Ibn Teymiyyənin "bəzi sələflər demişdir" sözü də buna dəlalət edir.

[4] Ibrahim (5), Loğman (31), Səbə (19), Şura (33).

[5] Əbu Nueym "Hilyətul övliyə" əsərində (10/197) öz sənədiylə Səhl bin Abdulla ət-Tusturidən belə rəvayət etmişdir: "Yalnız Allaha itaət edən Allaha sevimli olmaz, lakin Allahın qadağan etdiklərindən çəkinən Allahın sevimlisi olar. Asiliklərdən (günahlardan) çəkinməyə yalnız Allaha yaxın olan siddiqlər qadirdir. Yaxşı əməlləri isə həm yaxşı, həm də pis insan edə bilər."

**Birinci növ:** Xəstəliklər və s. kimi heç bir məxluqatın ixtiyarından asılı olmayan səmavi müsibətlər. Müsibətin bu növünə səbr etmək asandır. Çünki bəndə onun Allahın qəza və qədəri ilə olmasının və insanların buna müdaxilə edə bilməməsinin şahidi olur. Buna görə də ya ixtiyari, ya da məcburi olaraq səbr edir. Əgər Allah kimin qəlbini, müsibətdən doğan faydalar, həmçinin bu səbəblə nail olduğu lütf və nemətlər haqqında düşünməyə müvəffəq etsə, o, bu müsibətə səbr etməkdən, ona şükr etmək, razı qalmaq mərhələsinə keçmiş olar. Bu zaman başına gəlmiş müsibət onun üçün nemətə çevrilər. Qəlbi və dili hər zaman bu duanı edər: "Rəbbim Səni zikr etmək, Sənə şükür etmək və Sənə gözəl tərzdə ibadət etmək üçün mənə yardım et!"[6] Bu bəndənin Allaha olan məhəbbətinin güclü və ya zəif olmasından asılı olaraq güclü və ya zəif olur. Hətta bunu biz insanların sözlərində də görə bilərik. Necə ki, öz sevglisindən cəfa görən şair ona xitab edərək deyir (şerin mənası belədir):

Məni pis sözlərlə yada salmağın məni kədərləndirsə də,
(Pis sözlərlə də olsa) sənin yadına düşməyim məni sevindirir.[7]

**Ikinci növ:** Insanların əməlləri səbəbi ilə bir kəsin başına gələn müsibətlər. Bu həmin kəsin özünə, mal-dövlətinə və ya namusuna toxunmaqla ola bilər. Müsibətin bu növünə səbr etmək çox çətindir. Çünki insanın nəfsi özünün alçaldığını hiss edir və məğlub olmaq istəmir. Buna görə də intiqam almağa can atır. Müsibətin bu növünə yalnız peyğəmbərlər və siddiqlər səbr edə bilir. Peyğəmbərə (ona Allahın salavatı və salamı olsun) əziyyət verildiyi zaman deyərdi: ***"Allah***

---

[6] Müəllif bununla Muaz bin Cəbəlin (Allah ondan razı olsun) hədisinə işarə edir. Hansı ki, Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) onun əlindən tutaraq demişdir: "Ey Muaz Allaha and olsun ki, mən səni çox sevirəm. Sonra dedi: ey Muaz sənə tövsiyyə edirəm ki, hər namazdan sonra bu duanı deyəsən: Allahım Səni zikr etmək, Sənə şükür etmək və Sənə gözəl tərzdə ibadət etmək üçün mənə yardım et!" Hədisi əbu Davud "Sünən" əsrində "Vitr namazı" kitabı "Istiğfar (bağışlanma diləmək)" fəslində (2/181, hədis 1522); həmçinin Nəsai "Sünən" əsərində "Səhv" kitabı "Duanın başqa növü" fəslində (3/53); imam Əhməd "Musnəd" əsərində (5/245-247) rəvayət etmişdir.

[7] Bax: ibn əd-Dumeynənin Divanı, Əhməd Ratib ən-Nəffaxın tədqiqi ilə (səh: 17).

***Musaya rəhmət etsin. Ona daha çox əziyyətlər verilsə də səbr edərdi."***[8] Həmçinin xəbər vermişdir ki, peyğəmbərlərdən biri öz qövmü tərəfindən döyüldüyü zaman belə demişdir: ***"Allahım mənim qövmümü bağışla, çünki onlar bilmirlər."***[9] Peyğəmbərimizin də (ona Allahın salavatı və salamı olsun) öz qövmü tərəfindən əziyyət gördüyü zaman eyniylə belə dediyi rəvayət olunmuşdur.[10] O, bu duada üç məsələni bir arada cəm etmişdir: onları əfv etmək, onlar üçün bağışlanma diləmək və bilmədikləri üçün onları üzürlü hesab etmək. Səbrin bu növü kömək (qələbə), izzət, sevinc, əmin-amançılıq, qüvvət, Allaha məhəbbət, elmin artması və insanların onu sevməsi ilə nəticələnir. Uca Allah buyurur: **"(Çətinliklərə) səbr etdikləri və ayələrimizə ürəkdən inandıqları üçün Biz onlardan (İsrail oğullarından) əmrimizlə (insanlara) haqq yolu göstərən rəhbərlər təyin etmişdik."**[11] Səbr və yəqinliklə insan dində imamlığa yüksəlir. Bu səbrə güclü yəqinlik və iman  əlavə olunduqda bəndə Allahın fəziləti ilə xoşbəxtliyin uca məqamlarına yüksəlir. Bu, Allahın bəndələrindən istədiyinə verdiyi lütfüdür. Allah böyük lütf sahibidir.

Buna görə də uca Allah buyurur: **"(Ey mömin kimsə!) Sən (pisliyi) yaxşılıqla dəf et! (Qəzəbə səbirlə, cəhalətə elmlə, xəsisliyə comərdliklə, cəzaya bağışlanmaqla cavab ver!) Belə olduqda aranızda**

---

[8] Hədisi Buxari "Səhih" əsərində "Peyğəmbərlər" kitabında 28-ci fəsildə (3405), həmçinin Müslim "Səhih" əsərində "Zəkat" kitabı, "Qəlbləri yuşaltmaq üçün əta etmək" fəslində (3/109) rəvayət etmişdir.

[9] Hədisi Buxari "Səhih" əsərində "Peyğəmbərlər" kitabında 59-ci fəsildə (3477), həmçinin Müslim "Səhih" əsərində "Cihad" kitabı, "Uhud döyüşü" fəslində (5/179) rəvayət etmişdir.

[10] Abdulla ibn Məsud (Allah ondan razı olsun) deyir: "Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) Huneyn döyüşündə götrülmüş qənimətləri əl-Caranədə bölüşdürdüyü zaman insanlar onun üstünə axışdılar. Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) dedi: "Allah qullarından  birini öz qövmünə peyğəmbər olaraq göndərmişdi. Qövmü onu döymüş və yaralamışdı. O isə alnının qanını silə-silə deyirdi: Rəbbim mənim qövmümü bağışla, çünki onlar bilmirlər. Abdulla ibn Məsud (Allah ondan razı olsun) deyir: Sanki indi də gözümün önündə görürəm Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) alnından qanı silə-silə həmin kişinin hekayəsini danışır və deyir: Rəbbim mənim qövmümü bağışla, çünki onlar bilmirlər." Bu hədisi imam Əhməd "Musnəd" əsərində (7/378, hədis 4366) rəvayət etmişdir. Kitabın tədqiqatçısı bu hədisin səhih liğeyrihi dərəcəsində olduğunu demişdir.

[11] Səcdə (24)

**düşmənçilik olan şəxsi, sanki yaxın bir dost görərsən! Bu (xislət) yalnız (dünyada məşəqqətlərə) səbir edənlərə verilir və yalnız böyük qismət (savab, fəzilət) sahiblərinə əta olunur!**"[12] Yaxşılıqla dəf etmək, əfv etmə və s. bu kimi saleh əməllərlə olur. Böyük qismət isə, Cənnətdir.

Bu səbrə nail olmağa insana bir çox şeylər kömək edir. Bunlardan,

**Birinci:** Bəndələrin əməllərini, iradəsini, hərəkət və sükunətliliklərini uca və nöqsansız Allahın yaratmasına şahidlik etmək; Allahın istədiyi olur, istəmədiyi isə baş vermir. Nə yüksəklikdə, nə də dərinliklərdə bir zərrə belə ola bilməz ki, Allahın izni və istəyi olmadan hərəkət etsin. Insanlar isə yalnız hərəkətləri yerinə yetirlər. Buna görə də, başına gələn müsibətləri edən insanların kimliyinə baxma. Bax ki, onu sənə göndərən kimdir. Belə olduqda qəm-qüssədən, kədər və sıxıntılardan azad olarsan.

**Ikinci:** Öz günahlarını etiraf etmək və bilmək ki, Allah bu müsibətləri ona günahlarına görə göndərib. Uca Allah buyurur: "**Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların (etdiyiniz əməllərin) ucbatındandır! (Bütün bunlara baxmayaraq) Allah (günahlarınızın) çoxunu əfv edər.**"[13] Əgər insan bilsə ki, başına gələn bütün müsibətlərə səbəb onun günahlardır, onda insanları qınamaq, günahlandırmaq əvəzinə, günahlarına bağışlanma diləyər və tövbə edər. Işdi görsən ki, biri insanları ona əziyyət verdikləri üçün söyür və təhqir edir, lakin özünü qınamır və bağışlanma diləmir, bil ki, onun müsibəti həqiqi müsibətdir. Amma bağışlanma diləyib tövbə edər və deyərsə ki, bu mənim günahlarım ucbatındandır, onun üçün bu müsibət nemətə çevrilər.

Əli ibn Əbu Talib (Allah ondan razı olsun) məhşur bir kəlamında belə buyurur: "Bəndə gərək Rəbbindən başqa heç kəsdən istəməsin və öz günahlarından başqa heç nədən qorxmasın."[14] Həmçinin Əlidən (Allah

---

[12] Fussilət (34-35)

[13] Şura (30)

[14] Beyhəqi "Şuəbul iman" əsərində (7/122), (9718); əl-Əsbəhəni "ət-Tərğib vat tərhib" əsərində (2/266), (1586); ibn Abdulbərr "Cəmiu bəyənul elm və fadlih" əsərində (1/383), (547-548) rəvayət etmişdir.

ondan razı olsun) və başqalarından belə dedikləri rəvayət olunur: "Bəla yalnız günahların səbəbi ilə gəlir və yalnız tövbə ilə qaldırılır."[15]

**Üçüncü:** Bəndənin, Allahın əfv və səbr edənlərə gözəl aqibət verəcəyini bilməsidir. Uca Allah buyurur: **"Hər hansı bir pisliyin cəzası onun özü kimi bir pislikdir. Bununla belə hər kəs (pislik edəni) bağışlasa və (onunla) barışsa, onun mükafatı Allaha aiddir. Həqiqətən, O, zalımları sevməz!"[16]**

Insanlar əziyyətlərə qarşı üç sinfə bölünür:

Öznün haqqından daha artığını götürən, zalım;

Öz haqqı miqdarında götürən kəs, ədalətli (muqtəsid);

Öz haqqını tərk edib bağışlayan, muhsin.

Yuxarıdakı ayədə üç qismin hər biri qeyd olunmuşdur. Ayənin əvvəli muqtəsidlərə, ortası muhsinlərə, sonu isə zalımlara aiddir.

Qiyamət günü carçı: "kimin əcrini (savabını) verməyi Allah Özünə vacib edibsə ayağa qalxsın" deyə çağıracaq və yalnız əfv və islah edənlər

---

[15] Əz-Zubeyr ibn Bəkkar "Ənsab" əsərində Ömərin Abbasa (Allah hər ikisindən razı olsun) yağış namazı qılmasını buyurduğu zaman, onun uzun duasının bir hissəsində belə dediyini rəvayət edir: "Allahım, bəla yalnız günahların səbəbi ilə gəlir və yalnız tövbə ilə qaldırılır." (böyü alim ibn Həcər "əl-Fəth" əsərində (2/497) bu rəvayətin "Ənsəb" əsərində olduğunu söyləmişdir. Lakin həmin əsərin çap olunmuş hissəsində onu tapa bilmədim.)
Hicrətin 333 –cü ilində vəfat etmiş Əbu Bəkr Əhməd bin Mərvan əd-Deynuri "əl-Mucaləsə və cavahirul elm" əsərində (3/102-103) Ömərin Abbasa (Allah hər ikisindən razı olsun) yağış namazı qılmasını buyurduğu zaman, onun uzun yağış duasının bir hissəsində: "Allahım, göydən bəla yalnız günahların səbəbi ilə nazil olur və yalnız tövbə ilə qaldırılır." dediyini Abbasdan **"movquf"** (yəni, onun öz sözləri) olaraq rəvayət etmişdir.
Həmçinin bunu ibn Əsakir "Tarixud Dəməşq" əsərində (26/358-359, səh. 184 Ubadə bin Əvfi – Abdulla bin Sövbun təcumeyi-halında) Tariq əbu Saleh Bəzim mövla ibn Həninin yolu ilə Abbas bin Abdulmuttalibdən uzun bir hədisdə rəvayət etmişdir.
Buxarinin "Səhih" əsəsrində Ömərin Abbasa (Allah hər ikisindən razı olsun) yağış yağması üçün dua etməsini buyurması sabit olmamışdır. (əl-Fəth 2/494) "Yağış namazı" kitabı, "Quraqlıq zamanı insanların rəhbərdən yağış namazı qılmasını istəməsi" fəsli (1010-cu hədis). Lakin orada duanın necəliyi barədə təfsilata varmamış və bu rəvayəti qeyd etməmişdir.
Bu hədis haqqında bax: "Iqtidaus siratal mustəqim" (səh. 337-338)

[16] Əş-Şura (40)

qalxacaqdır.[17] Həmçinin insan bildikdə ki, intiqam almaqla nə qədər əcr itirəcək, onun üçün əfv və səbr etmək asanlaşar.

**Dördünçü:** bəndə əgər bağışlayar və yaxşılıq edərsə, bu əməli ona müsəlman qardaşlarına qarşı pis zənlər etməkdən, aldatmaqdan, intiqam almaqdan, pislikdən və kin bəsləməkdən çəkinməyi bəxş edər. Bununla da o, intiqam almaqla qazanacağı mənfəətdən, qat-qat artıq dünyada və axirət mənfəəti qazanmaqla əfv etmənin şirinliyini dadar və Allahın bu ayəsi ona aid olar: "**Allah yaxşı iş görənləri sevər!**"[18] Beləliklə də o Allahın sevimli bəndələrindən olar. Onun halı bir neçə dirhəm (gümüş) verib, minlərlə dinar (qızıl) götürənin halına bənzəyir. Insan buna nail olduğu zaman Allahın verdiyi bu nemətə görə hədziz dərəcədə sevinəcəkdir.

**Beşinci:** (Allah üçün deyil) özünə görə intiqam alan kəsə, bu əməlin zəlillik (alçaqlıq) bəxş edəcəyini, əfv edən kəsi isə Allahın ucaldacağını bilmək. Bu barədə Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) buyurmuşdur: ***"Allah, əfv edən bəndənin yalnız izzətini artırar."***[19] Əfv etməklə nail olduğu izzət onun üçün, intiqam almaqla nail olduğu izzətdən daha sevimli və daha faydalıdır. Çünki intiqam almaqla nail olduğu zahirən izzət olsada, daxilən zəlillikdir. Lakin əfv etmək daxilən zəlillik olsada o, həm zahirən, həm də daxilən izzət bəxş edir.

**Altıncı və ən böyük faydalardan biri:** Veriləcək cəzanın və ya mükafatın etdiyi əməlin növündən olmasını, həmçinin özünün zalım,

---

[17] Ibn Mərdəveyh ibn Abbasdan (Allah ondan razı olsun) rəvayət edir ki, peyğəmbər (ona Allahın salavatı və salamı olsun) buyurmuşdur: " Qiyamət günü Allah carçıya: "kimin əcrini (savabını) verməyi Allah Özünə vacib edibsə ayağa qalxsın" deyə çağırmağı əmr edəcək və yalnız bu dünyada əfv və islah edənlər qalxacaqdır." Uca Allah buyurur: "**Bununla belə hər kəs (pislik edəni) bağışlasa və (onunla) barışsa, onun mükafatı Allaha aiddir.**"

Hədisi Suyuti "əd-Durrul mənsur" əsərində (6/11); Xatib əl-Bağdadi "Tarix Bağdad" əsərində (11/198); ibn Hibban "Rovdatul uqalə" əsərində (səh. 176-177) Həsən əl-Bəsridən "mursəl" (yəni, onun sözləri) olaraq, Beyhəqi "Şuəbil iman" əsərində (13/136, hədis 7050) tam sənədlə, Həmməd bin əs-Səri "əz-Zuhd" əsərində (2/904) və Əbu Nueym "əl-Hilyə" əsərində (9/204) Həsən əl-Bəsridən "movquf" (yəni, onun sözləri) olaraq rəvayət etmişdir.

[18] Ali Imran (134, 148)

[19] Müslim "Səhih" əsərində rəvayət etmişdir; "Ədəb, yaxşılıq və qohumluq əlaqələri" kitabı, "Əfv etmənin müstəhəb (bəyənilən) olması" fəsli (8/20).

günahkar olduğunu bilmək; Əgər kim insanları əfv edərsə, Allah da onu əfv edər. Əgər bağışlayarsa, Allah da onu bağışlayar. Bəndə, insanların ona pislik etmələrinə baxmayaraq, onları əfv etməsinin, bağışlamasının və yaxşılıq etməsinin Allahın bu növ əməllərlə (yəni, günahlarını əfv etmək, bağışlamaq və yaxşılıq etməklə) mükafatlandırmasına səbəb olduğunu bilərsə əfv və səbr etmək ona asanlaşar. Ağıllı insana bu fayda kifayətdir.

**Yeddinci:** Intiqam almaqla və ona edilmiş zülmün əvəzini tələb etməklə məşğul olduqda vaxtının hədər getməsini, qəlbinin yalnız bunu düşünməsini (ibadətdən uzaq düşməsini), geri qaytarılması mümkün olmayan faydaların əldən çıxmasını bilmək; Yəqin ki bu, onun başına gələn müsibətdən daha əzəmətlidir. Lakin əfv etsə və bağışlasa həm qəlbi, həm bədəni onun üçün intiqam almaqdan daha mühüm olan faydalı işlərlə məşğul olmağa vaxt tapar.

**Səkkizinci:** Əgər bəndə özü (öz nəfsi, mənfəəti) üçün intiqam alırsa bilsin ki, Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) öz nəfsi üçün heç zaman intiqam almamışdır.[20] Halbuki ona verilən əziyyət dinlə bağlıdır və Allaha qarşı edilmiş sayılır və o, Allahın yaratdıqlarının ən xeyirlisi və Ona ən sevimli olanıdır. Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) insanların ən şərəflisi, üstünü, bütün pis əxlaqlardan uzaq, gözəl əxlaqa layiq olmasına baxmayaraq o, özü üçün bunu etməmişdir. O halda bizlərdən hər hansı bir kəs özünün hansı eyibləri və şər əməlləri olduğunu bilə-bilə necə (özü üçün) intiqam ala bilər. Əksinə arif (ağıllı) insan öz istəklərini (nəfsini), onun üçün intiqam alınacaq dərəcədə yüksək tutmaz. Belə insan üçün istəklərinin (nəfsinin), onun üçün intiqam alınacaq dərəcədə qədir-qiyməti yoxdur.

**Doqquzuncu:** Əgər insana, Allah üçün etdiyi əməllərə görə istər Allaha itaət olduğu üçün əmr, yaxud da asilik olduğu üçün qadağan etdiyi işlər olsun, əziyyət edilərsə ona səbr etmək vacib olur. Buna görə o, intiqam almamalıdır. Çünki ona Allah üçün etdiyi əməllərə görə əziyyət verilmişdir. Əcrini də Allah verəcəkdir. Buna görə də Allah

[20] Bax: Buxarinin "Səhih" əsəri, "Fəzilətlər" kitabı, "Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) sifəti" fəsli (hədis 3560). ("Fəthul bəri" 6/566), Müslimin "Səhih" əsəri, "Fəzilətlər" kitabı, "Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) günahlardan uzaq olması" fəsli (hədis 2327, 2328).

yolunda cihad edənlərin canları və malları tələf olsa da onlar bunu itirməmişlər. Allah onlardan canları və malları satın almış[21], qiymətini də insanlar deyil Allah Özü verəcəkdir. Kim bunun qiymətini insanlardan istəyərsə, Allah yanında onun qiyməti olmaz. Çünki kim bir şeyi Allah üçün tələf edərsə, onu əvəzini (əcrini) Allah verəcəkdir.[22]

Yox əgər, etdiyi asiliklərə görə ona əziyyət verilibsə, onda özünü qınasın. Insan özünü etdiyi asiliklərə görə qınayarsa, ona əziyyət verənləri qınamağa ehtiyac qalmaz.

Kim, bir şeyi əldə etmək üçün səy göstərdiyi zaman əziyyətə (müsibətə) düçar olarsa səbr etsin. Çünki nail olmaq istədiyi nəticəyə çatmamaq, səbr etməkdən daha acıdır. Kim günortanın istisinə, yağışa, qara, səfərin çətinliklərinə, yolkəsənlərin etdiklərinə səbr etmirsə, onun bazarlara ehtiyacı yoxdur (o dünyəvi işləri bacarmaz). Bu bütün insanlara məlum olan bir işdir ki, kim həqiqətən bir şeyi əldə etmək istəyirsə, buna nail olmaq üçün ona uyğun miqdarda da səbr etməlidir.

**Onuncu:** Bəndə səbr etdiyi təqdirdə, Allahın onunla olmasını, onu sevməsini və ondan razı qalmasını bilmək; əgər Allah kiminlə olarsa, ondan insanların dəf edə bilməyəcəyi zərərləri və bəlaları dəf edər. Uca

---

[21]Müəllif bu sözü ilə Tövbə surəsinin 111-ci ayəsini nəzərdə tutur: "**Allah, şübhəsiz ki, Allah yolunda cihad edən möminlərin canlarını və mallarını Cənnət müqabilində satın almışdır.**"

[22] Əbu Yalə "Musnəd" əsərində (4/36, hədis 2040) Bişr bin əl-Valid əl-Kindidən, o əl-Musəvvir bin əs-Saltdan, o Muhəmməd bin Munkədirdən o da Cəbirdən (Allah ondan razı olsun) rəvayət etmişdir ki, Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) buyurmuşdur: *"**Hər bir yaxşı əməl sədəqədir. Kişinin öz ailəsinə və malına etdiyi əta da onun üçün sədəqə yazılar. Həmçinin namusunu (şərəfini) qorumaq üçün sərf etdiyi də sədəqədir. Möminin tikintiyə (evə, binaya) və asiliklərə sərf etdiyindən başqa bütün məsrəflərinin əvəzini verməyə Allah zəmanət vermişdir.**"* Əl-Hesəmi "Məcməuz zəvaid" əsərində (3/136) bu hədis haqqında deyir: "Əbu Yalənin sənədində olan Musəvvir bin Salt zəif rəvayətçidir."

Həmçinin əd-Daraqutni "Sünən" əsərində (3/28, hədis 101) və əl-Hakim "əl-Mustədrək" əsərində (2/50), hər ikisi də Abdulhəmid bin əl-Həsən əl-Hiləlidən, o da Muhəmməd bin Munkədirdən eyniylə bu hədisi rəvayət etmişdir. Sonra əl-Hakim bu hədis haqqında demişdir: "Bu səhih hədisdir. Lakin Buxari və Müslim onu öz "Səhih" əsərlərində rəvayət etməmişdir. Bu mənalı hədisləri cəm etmək isə bu kitabın şərtlərinə uyğun deyil." əz-Zəhəbi onun bu sözlərinə etiraz edərək demişdir: "Əksinə onlar bu hədisin zəif olduğunu söyləmişdir."

Allah buyurur: "**Səbr edin, çünki Allah səbr edənlərlədir!**"[23] "**Allah səbr edənləri sevər!**"[24]

**On birinci:** Səbr etməyin imanın yarısı olmasını bilmək[25]; Əgər insan bunu bilərsə onda öz istəklərinin imanının bir hissəsindən belə üstün olmasına yol verməz. Həqiqətən səbr etmək insanın imanını saxlayar və onu naqisliklərdən qoruyur. Allah təalə iman gətirənləri mühafizə edir.

**On ikinci:** Səbrinin istəklərinə (nəfsinə) hakim, qalib, üstün olmasını bilmək; Elə ki, nəfsini alçaltdı, ona qalib gəldi, onda nəfsi onu özünə qul və əsir etməz, onu həlaka atmaz. Yox əgər insan nəfsinə tabe olarsa, onda nəfsi onu həlak edər. Yalnız Rəbbi ona rəhm edərsə, bu həlakdan xilas olar.

Səbr etməyin insanın nəfsi və şeytanı üzərində yalnız üstünlüyü (hökmranlığı) kifayət edər ki, qəlbi hökmran olsun və düşmənini dəf edə bilsin.

**On üçüncü:** Bəndə səbr etdiyi təqdirdə Allahın mütləq ona kömək edəcəyini bilmək; Çünki Allah səbr edənlərin və zalımları Allaha həvalə edənlərin hamisidir. Kim özü öz nəfsinə qalib gəlmək istəsə, Allah onu nəfsinin qulu edər. O, öz nəfsinin köməkçisi olar. Kömək edənlərin ən xeyirlisi olan Allahın yardımından uzaq düşüb, öz aciz, zəif nəfsi ilə yardımlaşanın halı necə olacaq?!

**On dördüncü:** Insanın ona əziyyət verənlərə səbr etməsi və (bu əziyyətlərə) dözməsi, zülümkarın peşiman olmasına, haqqa qayıtmasına, üzr istəməsinə, insanların onu qınamasına və bu yolla da onun utanmasına, sonunda isə əziyyət verdiyi insanla dost olmasına səbəb olar. Bu barədə uca Allah buyurur: "**(Ey mömin kimsə!) Sən (pisliyi) yaxşılıqla dəf et! (Qəzəbə səbirlə, cəhalətə elmlə, xəsisliyə comərdliklə, cəzaya bağışlanmaqla cavab ver!) Belə olduqda aranızda düşmənçilik olan şəxsi, sanki yaxın bir dost görərsən! Bu (xislət) yalnız (dünyada məşəqqətlərə) səbir edənlərə verilir və yalnız böyük qismət (savab, fəzilət) sahiblərinə əta olunur!**"[26]

---

[23]əl-Ənfal (46)

[24]Ali Imran (146)

[25] Bax: haşiyə-2.

[26] Fussilət (34-35)

**On beşinci:** Ola bilsin ki, onun intiqam alması zülümkarın fəsadının (şərinin) artmasına, ona verdiyi əziyyətin növlərini artırmasına səbəb olsun. Lakin səbr etsə və bağışlasa bu zərərlərdən qorunmuş olar. Ağıllı insan iki zərərli işin az zərərli olanını dəf etməklə, daha zərərli olanını seçməz. Neçə-neçə insanlar intiqam almaq və fəsadın qarşısını almaq istəmiş, lakin buna gücləri yetməmişdir. Çox-çox insanlar bu yolda canını tapşırmış, hakimiyyəti, mal-dövləti əlindən çıxmışdır. Lakin məzlum əff etsəydi buna düçar olmazdı.

**On altıncı:** Əgər kim səbr etməyib, intiqam alarsa zülümkarlığa düçar olar. Çünki insan intiqam aldığı zaman, onun istəkləri (nəfsi) həddini aşacaq və qəzəbindən nə dediyini və nə etdiyini bilməyəcəkdir. O, əvvəlcə başqalarının köməyini gözləyən məzlum idisə, indi qəzəb və cəzaya məruz qalan zalıma çevrilmiş olar.

**On yeddinci:** Insana edilmiş bu əziyyət (zülm) onun günahlarının bağışlanmasına və ya dərəcəsinin (məqamının) yüksəldilməsinə səbəbdir. Əgər səbr etməyib, intiqam alarsa nə günahlarına kəffarə, nə də dərəcəsinin (məqamının) yüksəldilməsinə nail olar.

**On səkkizinci:** Insanın səbr etməsi və bağışlaması düşməninə qarşı ən güclü silahıdır. Kim səbr edər və bağışlayarsa, bu, düşməninin alçalmasına, zəlil olmasına, ondan və insanlardan qorxmasına səbəb olacaqdır. Çünki o özü düşməninin zülmünə qarşı sussa da, insanlar buna susmayacaqlar (laqeyd qalmayacaqlar). Lakin intiqam alarsa, belə olmaz. Ona görə də görərsən ki, insanların əksəriyyəti, kimsə ona əziyyət verərsə və ya söyərsə, bunun əvəzini çıxmağa çalışır. Sanki, əvəzini çıxdıqda çiyinlərində olan ağır yükü üstündən atar və rahatlaşar.

**On doqquzuncu:** Əgər insan düşmənini (ona zülm edəni) əfv edərsə, düşməni onu özündən üstün və qalib gəlmiş, özünü isə ondan zəif görər. Bu da əfv edənə şərəf və fəzilət olaraq kifayətdir.

**Iyirminci:** Əgər insan əfv edər və bağışlayarsa bu yaxşılıqdır (həsənətdir). Bu yaxşılıqdan başqa bir yaxşılıq, ondan da başqa biri doğar. Və beləcə onun yaxşılıqları (həsənətləri) çoxalmaqda davam edər. Çünki yaxşılığın əcri, mükafatı ondan sonra yeni yaxşılığın edilməsidir. Necə ki, pisliyin cəzası ondan sonra yeni pisliyin edilməsidir. Ola bilər ki, bu əməli onun nicat tapmasına və əbədi xoşbəxtliyinə səbəb olsun. Yox əgər intiqam alar və qalib gəlməyə çalışarsa bu nemət əlindən çıxar.

Dinin ikinci əsası isə şükürdür. Şükür Allah təaləyə itaətdə olmaqdır.

Allahın köməyi ilə tamam oldu. Ona həmd-səna olsun.

Peyğəmbərimiz Məhəmmədə və onun ailəsinə Allahın salavatı və salamı olsun.